**Çox hörmətli professor Ələddin Allahverdiyev!**

May ayının 29-da Sizin 70 yaşınız tamam olur. Bu münasibətlə Sizi səmimi qəlbdən təbrik edir, Sizə Aşıq Alı, Aşıq Ələsgər ömrü arzu edirəm.

Hörmətli Ələddin müəllim! Siz tarixi torpağımız olan Göyçə mahalının Kəsəmən kəndində anadan olmusunuz. Doğulduğunuz kənddə ibtidai təhsilə başlamış, 1964-cü ildə isə Bakı şəhərindəki 190 saylı orta məktəbi medalla bitirmisiniz. Onu da qeyd edim ki, Siz həm də məktəbi medalla bitirən ilk Kəsəmənlisiniz. Bunu Sizin haqqınızda bir il öncə Azərbaycanca, ingiliscə və türkcə yazdığım Vikipediya məqalələrini hazırlayan zaman apardığım araşdırmalardan məlum oldu. Siz orta məktəbi bitirdikdən sonra Azərbaycan Dövlət Universitetinin mexanika-riyaziyyat fakültəsinin mexanika şöbəsinə daxil olmusunuz. Üçüncü kursu bitirdikdən sonra Moskva Dövlət Universitetinin mexanika-riyaziyyat fakültəsində təhsilinizi davam etdirməyə başlamısınız. Həmin Universiteti bitirdikdən sonra onun aspiranturasında saxlanılmış, Moskva Dövlət Universitetinin qapalı Elmi Şurasında "Pyezoelektrik konstruksiyaların əlaqəli rəqslərdə elektrofiziki parametrlərinin tədqiqi" mövzusunda namizədlik dissertasiyası müdafiə etmiş və fizika-riyaziyyat elmləri namizədi elmi dərəcəsi almısınız. Onu da qeyd edim ki, elmi rəhbəriniz tanınmış alim, Sosialist Əməyi Qəhrəmanı akademik Xəlil Raxmatulin olmuşdur.

Moskva Dövlət Universitetində təhsilinizi başa vurduqdan sonra təyinatla SSRİ Elektron Sənayesi Nazirliyinin Ümumittifaq Elmi-Tədqiqat “FONON” institutuna işə qəbul edilmiş, 1974-1994-cü illərdə kiçik elmi işçi, baş elmi işçi və “Riyazi modelləşdirmə” şöbəsinin müdiri vəzifələrində çalışmısınız.

Siz 2001-ci ildə Rusiya Federasiyasının Ali Attestasiya Komissiyasının qərarı ilə professor elmi adına layiq görülmüsünüz. Sizin elmi rəhbərliyiniz altında 7 nəfər (o cümlədən 3-ü azərbaycanlı) namizədlik dissertasiyası müdafiə etmiş, onlarla dissertasiyanın müdafiəsində rəsmi opponent olmusunuz. 1994-1995-ci illərdə Rusiya-ABŞ müştərək "Qreen Star İnternational" şirkətində Baş Direktorun elm və istehsalat işləri üzrə müavini vəzifəsində çalışmış, 1995-1996-cı illərdə Moskvanın Zelenoqrad şəhər Orta və Kiçik Biznes Müəssisələri Assosiyasının direktoru işləmisiniz.

Siz 1996-cı ilin sentyabrından Moskva Dövlət Biznesi İdarəetmə Akademiyasında ali və tətbiqi riyaziyyat kafedrasının müdiri

və professoru vəzifələrində işə başlamış, 1997-1999-cu illərdə eyni zamanda iqtisadiyyat və menecment fakültəsinin dekanı olmuş, 2000-ci ildən etibarən həmin Akademiyanın 1-ci prorektoru – tədris-metodika işləri üzrə prorektoru vəzifəsində çalışmısınız. Bu illər ərzində ali və tətbiqi riyaziyyat (riyaziyyatın iqtisadiyyatda və menecmentdə tətbiqinə aid) sahələrinə həsr olunmuş 24 monoqrafiya, dərslik və dərs vəsaitləri çap etdirmisiniz.

Siz həmçinin Rusiya Federasiyası Ali Məktəblərinin təhsil üzrə prorektorları Şurasının, Moskva şəhəri Təhsil Departamentinin koordinasiya Şurasının, MDBİA-nın Elmi Şurasının üzvü, həmin Akademiyanın Tədris-metodika Şurasının sədri vəzifələrində olmusunuz. Hal-hazırda Siz "MİET" Milli Tədqiqat Universitetində professor, tədris işləri üzrə prorektor müavini, tədris prosesinin keyfiyyəti sahəsinin rəhbərisiniz. Siz beş ildən bir keçirilən Dünya Azərbaycanlılarının bütün qurultaylarının nümayəndəsi də olmusunuz.

Hörmətli professor Ələddin Allahverdiyev! Siz məxfi elmi - texniki işləriniz də daxil olmaqla 450-dən çox monoqrafiya, ixtira, elmi məqalə, dərslik və dərs vəsaitinin müəllifisiniz.

Siz ümumən 30-dan çox beynəlxalq, ümumittifaq elmi konfrans, qurultay və simpoziumda pyezoelektrik mühitlərdə dalğaların yayılmasının, pyezokeramik konstruksiyaların əlaqəli rəqslər zamanı elektrofiziki parametrlərinin tədqiqinə həsr edilmiş 60-dan çox elmi məruzə, o cümlədən 10-a yaxın sifarişli məruzə ilə çıxış etmisiniz. Bir çox adı çəkilən konfransların təşkilat və ya proqram komitələrinin üzvü olmusunuz. Siz hələ aspirant olarkən 1973-cü ildə Bakı şəhərində keçirilən aeronavtika üzrə beynəlxalq konfransda da iştirak etmisiniz.

Əzizim Ələddin müəllim!

Siz "Moskvanın 850 illiyi" dövlət medalı ilə, üç dəfə - 1975, 1977 və 1980-ci illərdə Sov.İKP MK-nın, SSRİ Nazirlər Sovetinin, Həmkarların MK-nin, ÜİLKGİ MK-nin təsis etdiyi "Əməkdə fərqlənməyə görə" döş nişanları ilə təltif olunmusunuz.

Siz "Rusiya Federasiyasının ali peşə təhsilinin fəxri işçisi" adına və döş nişanına layiq görülmüş, Ümumrusiya Sərgi Mərkəzinin qızıl medalı, "M.V.Lomonosov adına MDU-nun 250 illiyi" yubiley medalı ilə də təltif edilmisiniz.

**Hörmətlə Araz Yaquboğlu,**
**29 may 2017-ci il,**
**Bakı şəhəri.**